HİKMƏT TOXUMU

# RAMAZANIN SON ON GÜNÜNDƏKİ İBADƏTLƏR

Həmd Allaha məxsusdur. Salat və salam Allah Rəsulunun ﷺ, ailəsinin, səhabələrinin ؓ və onu özünə dost edənlərin üzərinə olsun. Sonra:

Buxarinin Ramazanın son on günündəki əməlləri və Müslimin Ramazanın son on günündəki ictihadlar mövzusunda möminlərin anası Aişədən ؓ belə rəvayət edir: Aişə ؓ belə dedi: "Nəbi ﷺ Ramazanın son on günü girdiyində ətəyini toplayar (zövcələri ilə yaxın olmaqdan imtina edər), gecəsini ibadət və Allaha itaətlə əhya edər və ev əhlini (gecə namaz qılmaqları üçün) oyadardı."

Müslimin Aişədən ؓ olan rəvayətində isə Aişə ؓ belə dedi: "Allah Rəsulu ﷺ Ramazanın son on günündə digər günlərdən daha çox ibadət edərdi."

Buna görə də Nəbi ﷺ Ramazan ayının son on gününün gecələrini ibadətlərə ayırar, ibadət etməyə xüsusi diqqət edər və (insanları və əhlini) buna (Ramazanın son on günündəki ibadətlərə) təşviq edərdi.

Bu ibadətlər aşağıdakılardır:

**1) Gecənin əhya edilməsi:**

Gəcənin əhya edilməsindəki qəsd, yəni gecəni namaz, Quran, zikr və digər ibadətlərlə keçirmək deməkdir. Hədisdə gecənin əhya edilməsindən məqsəd, gecənin bütününün əhya edilməsi ehtimalı olduğu kimi, gecənin böyük hissəsinin əhya edilməsi ehtimalı da ola bilər. Ona görə gücü çatan hər kəs gücünün çatdığı qədərilə gecəni əhya etməyə çalışsın və bu əməldə bir-biri ilə yarışsınlar.

**2) Əhlini oyatması:**

Aişənin ؓ : "və ev əhlinin oyadardı" sözündən qəsd, yəni xanımlarını gecə namazı qılmaq üçün oyadardı.

Əlidən ؓ belə rəvayət edildi: Allah Rəsulu ﷺ ramazanın son on günündə ev əhlini (gecə namazı qılmaq üçün) oyadardı. [Həsən hədis, Tirmizi



rəvayət etdi]

İbn Ömərdən ؓ belə rəvayət edildi: İbn Xəttab ؓ gecə yarısı olduğu vaxt namaz üçün ev əhlini oyadar və bu ayəni oxuyardı: "Ailənə namazı əmr et və özün də ona davam et" [Səhih hədis, Malik Muvattada rəvayət etdi]

Süfyan əs-Sövri belə dedi: Ramazanın son on günü girdikdə gecə təhəccüd qılmaq, bu gecələri əhya etməyə çalışmaq və əgər buna gücü çatırsa ev əhlinin və övladının namaza oyandırılması mənə xoş gəlir. [Lətaiful Məarif Fimə Liməvasimil-Amm Minəl-Vəzaif li İbni Rəcəb əl-Hənbəli]

**3) İzarını bağlamaq:**

Bunun təfsirində belə deyilmişdir: İbadətləri etməyə çalışmaq. Lakin bu təfsir zəifdir. Çünki, Aişə ؓ belə dedi: (cəddə və şəddə əl-mizər/cimadan uzaq olmağa çalışar və ibadəti çox edərdi) sözündəki "şəddə mizər" kəlməsini Nəbinin ﷺ cəddə/yəni çalışdı kəlməsinə aid etdi. Elm adamlarının üzərində dayandığı səhih görüş məhz budur. İzarını bağlamaq, qadınlardan uzaq olmaq deməkdir. Nəbinin ﷺ ramazanın son on günündə etiqaf etməsi də kəlmənin bu mənada olduğunu təsdiq edir. Çünki, etiqaf edən kəsin qadına yaxınlaşması (cima etməsi) caiz deyildir.

**4) Etiqaf:**

Etiqaf, məsciddə qalıb ibadətlərə yönəlmək və axirətlə məşğul olmaq üçün dünyəvi işlərlə bağları kəsmək deməkdir.

Səhihlərdə Aişədən ؓ rəvayət edilir: Nəbi ﷺ Ramazanın son on günündə, Allah onu vəfat etdirənə qədər etiqafa girərdi. Onun vəfatından sonra isə xanımları etiqafa girməyə davam etdilər.

Nəbi ﷺ bu on gündə bütün vaxtını Rəbbinə ibadət etmək, ona sığınmaq, onu zikr etmək və ona dua etməklə məşğul olmaq üçün etiqaf edərdi.

**5) Qədr gecəsini müşahidə etmək:**

Nəbi ﷺ belə buyurdu: **"Qədr gecəsini**



**ramazanın son on günü içərisində axtarın!"** [Muttəfəkun aleyhi]

Həmçinin belə buyurdu: "**Hər kim fəzilətinə inanaraq və qarşılığını Allahdan gözləyərək Qədr gecəsini dəyərləndirərsə keçimş günahları bağışlanar.**

Allah qatında bu gecənin fəziləti böyükdür. Bu gecədə edilən ibadətlərin savabı digər min aydakı gecələrdəki savablara bərabərdir.

**6) Quran oxumaq:**

Bu ayda Allahın kitabını (Qurani-Kərimi) oxumaq olduqca önəmlidir.

Allahu Təalə belə buyurdu: **"İnsanlara doğru yolu göstərən, bu yolun və (haqqı batildən) ayırd edənin açıq-aydın dəlilləri olan Quran ramazan ayında nazil edilmişdir."** [Bəqərə 185]

Bunun üçün Allah Rəsulu ﷺ ramazanın hər gecəsində Cəbrayıl ؑ ilə bərabər Quran oxumağa xüsusi diqqət göstərərdi. [Muttəfəqun aleyhi]

Xüsusilə ramazanın son on günündə Quranı daha çox oxuyardı. Həmçinin, sələf də bu ayda Quran oxumağın fəzilətini bildiklərindən dolayı bu ayda Quran oxumağa xüsusi diqqət edər və son on günün gecələrində bunu daha da artırardılar. [İbn Həcərin Lətaiful-Məarif kitabı]

Son olaraq: Ey Müsəlman, bu on gün üçün səylərini daha da artır. Vallahi bu on gün ibadətləri ən gözəl şəkildə yerinə yetirmək istəyənlər üçün böyük nemətdir və bu sizlər üçün böyük fürsətdir. Bu fürsəti əldən vermə. Elm əhlinin də açıqladığı kimi bu on gecə, ilin bütün gecələrinə baxaraq ən fəzilətli gecələrdəndir.

Allahım, bizi ramazanın son on gecələrində ibadətlərimizi gözəl şəkildə edə bilməyimizi bizə nəsib et və bunu bizə asanlaşdır.

Allahın, salat və salam Nəbimiz Muhammədin ﷺ ailəsinə və səhabəsinin üzərinə olsun.